# MƏDİNƏYƏ ZİYARƏT ƏDƏBİ

Şübhəsiz ki, həmd ALLAH`a məxsusdur! Ona həmd edir, Ondan yardım və bağışlanma diləyirik! Nəfslərimizin şərindən və pis əməllərimizdən ALLAH`a sığınırıq! ALLAH kimə hidayət versə, heç kim onu azdıra bilməz! Kimi də azdırsa, heç kim ona hidayət verə bilməz! Şəhadət edirəm ki, ALLAH`dan başqa haqq ilah yoxdur. O, Təkdir və şəriki yoxdur. Şəhadət edirəm ki, Muhəmməd ﷺ Onun qulu və Rəsuludur. ALLAH ﷻ Ona, əhli-beytinə və əshabına çoxlu xeyir-dua və salam etsin!

***"Ey iman gətirənlər! ALLAH`dan layiqincə qorxun! Yalnız müsəlman olduğunuz halda (****müsəlman kimi****) ölün!"***[1]

***"Ey insanlar! Sizi tək bir şəxsdən (****Adəmdən****) xəlq edən, ondan zövcəsini (****Həvvanı****) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən RƏBB`inizdən qorxun! (****Adı ilə****) bir-birinizdən (****cürbəcür şeylər****) istədiyiniz ALLAH`dan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, ALLAH sizin üzərinizdə gözətçidir!"***[2]

---

1 Ali-İmran surəsi, 3/102.

2 ən-Nisa surəsi, 4/1.

***"Ey iman gətirənlər! ALLAH`dan qorxun və doğru söz söyləyin! (**Əgər belə etsəniz, ALLAH**) əməllərinizi islah edər və günahlarınızı bağışla-yar. Hər kəs ALLAH`a və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (**Cənnətə**) nail olar."*[3]

Ey müsəlmanlar!. Mədinə-i Nəbəviyyəyə gələnlər. Gözəl bir yerə gəldiniz və gözəl bir qazanc əldə etdiniz. Mədinədəki əməlləriniz xeyirli olsun! ALLAH ﷻ saleh əməllərinizi qəbul etsin! Sizi xeyirli əməllərinizə çatdırsın! Hicrət və zəfər yurdu, Muhəmməd Mustafanın ﷺ və fəzilətli səhabələrin hicrət etdikləri şəhər, Ənsarların diyarı Mədinəyə xoş gəldiniz. Sizlər bu ölkədə, Harameyn-i Şərifeyn ölkəsində ailəniz, qohumlarınız və sizi sevənlər arasındasınız. Sizə xidmət etmək onlar üçün bir şərəfdir. Sizin rahatlığınız onların arzusudur. Ehtiyaclarınızı təmin etmək onla-

---

3 əl-Əhzab surəsi, 70-71.

rın vəzifəsidir. Bu diyar sizin diyarınız, bu öl-kə sizin ölkənizdir.

Ey Mədinənin qonaqları! Sizlər Mək-kədən sonra yer üzünün ən xeyirli torpağı və ən şərəflisi sayılan bir məkandasınız. Bunun qiymətini və dəyərini bilin! Hörmətinə və müqəddəsliyinə diqqət edin! Burada ən gözəl ədəb ilə davranın! Bilin ki ALLAH عز وجل, Mədi-nədə bidət icad edəni ən pis əzab ilə təhdid etmişdir. Əbu Hureyrə رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Mədinədə A`yr ilə Sevr arası haram mə-kandır. Kim orada bir bidət icad edərsə və ya bir bidət icad edənə sığınacaq verərsə ALLAH`ın, mə-ləklərin, və bütün insanların lənəti onun üzə-rinədir. ALLAH, Qiyamət günü ondan nə fərz nə nafilə heç bir əməlini qəbul etməz!"*[4]

Kim Mədinədə bir günah işləsə və ya günah işləyənə sığınacaq verər və qoruyarsa

---

4 əl-Buxari. Muslim.

özünü alçaldıcı bir əzaba və aləmlərin RƏBB`inin qəzəbinə düçar etmişdir.

Şübhəsiz ki, bidətlərin ən böyüyü bidət edərək Mədinənin saflığını pozmaq, xurafələrlə bulandırmaq və təmiz torpağını bidət görüşlər, şirk və İslama zidd olan müxtəlif düşüncələr və haramlar əhatə edən kitablar yayaraq çirkləndirməkdir. Bu bidətləri icad edən və sığınacaq verənin günahı eynidir.

Ey öncəkilərin və sonrakılərin seyyidinin ﷺ məscidinə gələn ziyarətçi! Bu ziyarətinlə əlaqəli hökmləri anladınmı? Bu hökmlərdən halal və haram olanını öyrəndinmi? Yoxsa sən də cahili təqlid edən, elmsiz insanlara uyan və Rəsulullahın ﷺ sünnəsindən xəbərsiz olanlardansan?

Ey dəyərli ziyarətçi! İndi sənə bir neçə söz deyəcəm və Quran və sünnədən seçilmiş bəzi öyüdlər verəcəm. Bunlar, bu ziyarətinlə əlaqəli hökmlər haqda səni məlumatlandırmaq üçün bəzi işarələrdir. Müsəlman, Quran

və Sünnə ilə azmışların zəlalətindən və cahillərin cahilliyindən, sözlərdə və davranışlardakı bidətlərdən qorunur.

Ey müsəlmanlar!.. Məscid-i Nəbəvini ziyarət etmək sünnələrdən biridir və vacib deyildir. Bu ziyarətin həcc ilə bir əlaqəsi yoxdur. Həcci tamamlayan davranışlardan da deyildir. Məscid-i Nəbəvini və ya Rəsulullahın ﷺ qəbrini ziyarətin həcc ilə əlaqəsi haqda rəvayət edilən hədislər uydurma və yalandır. Kim Mədinəyə Məscid-i Nəbəvini ziyarət et-mək üçün gəlirsə, məqsədi qəbul olunar və davranışı (savabla) mükafatlandırılar. Kim də qəbirləri ziyarət etmək və onlardan yardım diləmək üçün Mədinəyə gəlirsə, məqsədi haramdır və etdiyi rədd edilər. Əbu Hureyrə رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Ancaq üç məscidi ziyarət etmək məqsədilə səfərə çıxılır: Məscid-u`l-Haram, mənim bu məscidim (Məscidu`n-Nəbəvi) və Məscidu`l-Aqsa."*[5]

Cabir ﵁, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Səfərə çıxılan yerlərin ən xeyirlisi bu məscidim (Məscid-u`n-Nəbəvi) və Beytu`l-A`tiq (Kəbə)`dir."*[6]

Ey müsəlmanlar! Məscid-i Nəbəvidə qılınan namazın fərz və ya nafilə olsun qat-qat savabı vardır. Rəsulullah ﷺ belə buyurur:

*"Bu məscidimdə qılınan bir namaz, Məscid-u`l-Haramdan başqa digər məsciddə qılınan min namazdan daha üstündür."*[7]

---

5 əl-Buxari. Muslim.
6 Əhməd İbn Hənbəl.
7 əl-Buxari. Muslim.

Fəqət, Məscid-i Nəbəvidə qılınan namazın savabı qat-qat çox olsa da nafilə namazı evdə qılmaq daha fəzilətlidir. Çünki Rəsulullah ﷺ belə buyurmuşdur:

*"Şübhəsiz ki, namazların ən fəzilətlisi, fərz namazlardan başqa, insanın evində qıldığı namazdır."*[8]

Ey bu uca məscidi ziyarətə gələn dəyərli ziyarətçi! Bil ki, Məscid-i Nəbəvinin dirəkləri, divarları, qapıları, mehrabı və minbəri kimi bölümlərinə əl sürtərək və ya öpərək bərəkət ummaq caiz deyildir. Eyni şəkildə Rəsulullahın ﷺ qəbrinin olduğu bölümü əllə salamlayaraq, öpərək və ya paltarı sürtərək bərəkət ummaq da caiz deyildir. Bu bölümü tavaf etmək də caiz deyildir. Kim bunlardan birini edərsə, tövbə etməsi və bu işi bir daha etməməsi vacibdir.

---

8 əl-Buxari. Muslim.

Məscid-i Nəbəvini ziyarət edənin, Ravza-i Şərifdə (Rəsulullahın ﷺ evi ilə minbəri arasındaki məkan) iki rükət və ya dilədiyi qədər nafilə namaz qılması məşrudur. Çünki bunun fazirləti haqqında dəlil vardır. Əbu Hureyrə رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Evimlə minbərimin arası cənnət baxçalarından bir baxçadır və minbərim hovuzumun üzərindədir."*[9]

Yezid ibn Əbi Ubeydə رضي الله عنه belə deyir: "Sələmə ibn əl-Əkva` رضي الله عنه ilə (Məscidu`n-Nəbəviyə) gəlirdim. Mushafın qoyulduğu yerin yanındakı dirəyin dibində, yəni Ravza-i Şərifdə namaz qılardı. Dedim ki: "Ey Əba Muslim! Bu dirəyin yanında namaz qılmağa çalışdığını görürəm." Belə dedi: "Rəsulullahın ﷺ, onun yanında namaz qılmağa çalışdığını gördüm."[10]

---

9 əl-Buxari. Muslim.
10 əl-Buxari. Muslim.

Ravza-i Şərifdə namaz qılmağa çalışmaq, insanların haqqını pozmağı, zəifləri və gücsüzləri itələməyə sövq etməməlidir. Mədinəni ziyarət edənin və orada yaşayanın Rəsulullaha ﷺ tabe olaraq ümrə savabı qazanmaq məqsədilə namaz qılmaq üçün Quba Məscidinə getməsi məşrudur.

Səhl ibn Cuneyf رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Kim bu məscidə (Quba Məscidinə) gəlmək üçün evindən çıxar və burada namaz qılarsa, bu ümrəyə bərabər olar."*[11]

İbn Macəhdəki rəvayət belədir:

*"Kim evində təmizlənər sonra Quba Məscidinə gələr və orada namaz qılarsa ona ümrə savabı vardır."*[12]

---

11 Əhməd İbn Hənbəl.

12 İbn Macəh.

Səhiheyndə (əl-Buxari və Muslim) Rəsulullahın ﷺ Quba Məscidinə hər şənbə günü ayaqla və minək üstündə gəldiyi və orada iki rükət namaz qıldığı rəvayət edilir.[13]

Ey dəyərli ziyarətçi! Mədinə-i Nəbəviyyədə bu iki məsciddən, Rəsulullahın ﷺ məscidi və Quba Məscidindən başqa digər bir məscidi ziyarət etmək məşru deyildir. Ziyarətçinin və ya başqasının xeyir əldə etmək ya da orada ibadət etmək məqsədilə şəriətin müstəhəb görmədiyi (savab görmədiyi) bir yerə xüsusilə getmək məşru deyildir. Rəsulullahın ﷺ əmr etdiyi və ziyarətinə həvəsləndirdiyi yerlərdən başqa, Rəsulullahın ﷺ və ya səhabələrin namaz qıldığı yerləri və məscidləri, orada namaz qılmaq və ya dua etmək və buna bənzər məqsədlərlə axtarmaq da məşru deyildir. Marur ibn Suveyddən رضي الله عنه belə dediyi rəvayət edilir: Ömər ibn əl-Xattab

---

13 əl-Buxari. Muslim.

رضي الله عنه ilə birlikdə yola çıxmışdıq. Yolun bir bölümündə qarşımıza bir məscid çıxdı. İnsanlar dərhal orada namaz qılmağa başladılar. Ömər رضي الله عنه "Nə edirsiniz?" dedi. Dedilər ki: "Bu, Rəsulullahın ﷺ namaz qıldığı bir məsciddir. Ömər رضي الله عنه belə dedi: "Ey insanlar! Şübhəsiz sizdən öncəkilər, belə şeylərə tabe olduqları üçün həlak oldular. Kimə orada bir namaz (vaxtı) rast qəlsə, orada namaz qılsın! Kimə də orada bir namaz (vaxtı) rast qəlməsə keçib getsin!"[14]

Ömər İbn əl-Xattaba رضي الله عنه bir grup insanın Rəsulullaha ﷺ beyət edilən ağacın altına getdikləri xəbəri çatdıqda, Ömər رضي الله عنه ağacın kəsilməsini əmr edir və ağac kəsilir.[15]

Ey müsəlmanlar!. Məscidu`n-Nəbəvini ziyarət edən kişilərə Rəsulullahın ﷺ qəbrini və iki səhabəsinin, Əbu Bəkr رضي الله عنه və Ömərin رضي الله عنه qəbirlərini onlara salam vermək və onlar üçün

---

14 İbn Əbi Şeybə.
15 İbn Əbi Şeybə.

dua etmək məqsədilə ziyarət etməsi məşrudur. Qadınların isə qəbirləri ziyarət etməsi caiz deyildir. Bu alimlərin görüşlərindən ən doğru olanıdır.

İbn Abbasdan رضي الله عنهما rəvayət edilən bir hədisdə, Rəsulullahın ﷺ qəbirləri ziyarət edən qadınlara və qəbirlərin üstündə məscid tikənlərə və şam yandıralara lənət etdiyini bildirilir.[16]

Əbu Hureyrədən رضي الله عنه rəvayət edilən bir hədisdə, Rəsulullahın ﷺ qəbirləri çoxlu ziyarət edən qadınlara lənət etdiyini bildirilir.[17]

Rəsulullahın ﷺ qəbrini ziyarət etməyin şəkli belədir: Ziyarətçi Rəsulullahın ﷺ qəbrinə gəlir və üzünü qəbrə döndərərək *"əs-Salamu a`ləykə ya RasulALLAH/Sənə salam olsun ey ALLAH`ın Rəsulu!"* deyir, yarım metr sağına irəliləyir və *"əs-Salamu a`ləykə ya Əba Bəkr/Sənə salam olsun ey Əbu Bəkr!"* deyərək

---

16 Əbu Davud. ət-Tirmizi. İbn Macəh.
17 ət-Tirmizi.

Əbu Bəkrə salam verir. Yenə yarım metr sağına doğru irəlləyir və *"əs-Salamu a`laykə ya Ömər/ Sənə salam olsun ey Ömər!"* deyərək Ömərə salam verir.

Ziyarətçi bu xətalara düşməkdən çəkinməlidir:

**Birinci xəta:** Rəsulullaha ﷺ (bir şey istəmək üçün) dua etmək, Ona ﷺ səslənmək və Ondan ﷺ yardım diləmək. Bəzi insanlar belə deyir: "Ey ALLAH`ın Rəsulu! Xəstəmə şəfa ver!" "Ey ALLAH`ın Rəsulu borcumun ödənməsinə yardım et!" "Ey dilək qapım!" Bu və buna bənzər sözlər, şirk sözlərdən və bidət davranışlardandır. ALLAH`ın qulları üzərindəki haqqı olan tövhidə ziddir.

**İkinci xəta:** Qəbrin önündə sağ əli sol əl üzərinə bağlayaraq namazda olduğu kimi durmaq. Bu haram olan bir davranışdır. Çünki bu duruş boyun əymə və ibadət ifadə edir və ancaq ALLAH ﷻ üçün edilə bilər.

**Üçüncü xəta:** Qəbir önündə əyilmək, səcdə etmək və ya buna bənzər ALLAH`dan ﷻ başqası üçün edilməsi caiz olmayan hərəkətlər etmək. Kays ibn Sa`d رضي الله عنه belə deyir: Hıyraya (Küfə yaxınlarında bir bölqə) getdim və orada qəhramanlarına səcdə etdiklərini gördüm. Dedim ki: "Rəsulullah ﷺ, səcdə edilməyə daha layiqdir. Rəsulullahın ﷺ yanına gəldim və "Hıyraya getdim və onların qəhramanlarına səcdə etdiklərini gördüm. Ey ALLAH`ın Rəsulu! Sənə səcdə etməyimiz daha layiqdir" dedim. Rəsulullah ﷺ belə buyurdu:

*"Nə deyirsən, qəbrimin yanından keçsən ona səcdə edərsən?"*

"Xeyir" dedim. Rəsulullah ﷺ belə buyurdu:

*"Belə etməyin (yəni səcdə etməyin)."*

Ənəs ﷺ, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Bir insanın, başqa bir insana səcdə etməsi doğru deyildir."*[18]

**Dördüncü xəta:** Qəbirlərin yanında ALLAH`a ﷻ dua etmək və ya qəbirlərin yanında edilən duanın qəbul edildiyinə inanmaq. Bu da haram edilən bir davranışdır. Çünki şirkə yol açan səbəblərdəndir. Qəbirlərin yanında və ya Rəsulullahın ﷺ qəbrinin yanında dua daha fazilətli ya da daha doğru, ALLAH`a ﷻ daha sevimli və qəbul edilməyə daha layiq olsaydı, Rəsulullah ﷺ bizləri buna həvəsləndirərdi. Çünki O ﷺ, cənnətə yaxınlaşdıracaq heç bir şeyi buraxmamış, ümmətini ona həvəsləndirmişdir.

Rəsulullah ﷺ belə bir tövsiyə etmədikdə, bunun məşru olmayan bir davranış,

18 Əhməd İbn Hənbəl.

haram olan və qadağan edilən bir iş olduğu bilinir. Əbu Ya`la رحمه الله və Hafiz Ziya əl-Maqdisi رحمه الله bunu rəvayət edir: “Əli ibn Huseyn رحمه الله, Rəsulullahın ﷺ qəbrinin yanındakı bir boşluğa gələn bir adam görür. Adam ora girir və dua edir. Əli ibn Huseyn رحمه الله adamı bundan çəkindirərək belə deyir: “Sizə atamdan eşitdiyim, onun da babasından, onun da Rəsulullahdan ﷺ eşitdiyi bir hədis söyləyimmi?:

*“Qəbrimi bayram yerinə və evlərinizi qəbirlərə çevirməyin! Mənə xeyir-dua edin! Çünki salamınız harada olsanız da mənə çatar!”*

**Beşinci xəta:** Mədinəyə gələ bilməyənlərin, bəzi ziyarətçilərlə, Rəsulullaha ﷺ salam göndərməsi və bəzi ziyarətçilərin bu salamı çatdırmağa razılaşması. Bu, bidət olan bir davranış və sonradan uydurulmuş bir işdir. Ey Rəsulullaha salam göndərənlər və bu salamı

daşıyanlar! Rəsulullahın ﷺ dediyini etməyiniz sizə kifayətdir. Rəsulullah ﷺ belə buyurur:

*"Mənə xeyir-dua edin! Çünki salamınız harada olsanız da mənə çatar!"*

Yenə belə buyurur:

*"ALLAH`ın yer üzündə gəzən mələkləri vardır, mənə ümmətimdən salam çatdırırlar."*[19]

**Altıncı xəta:** Rəsulullahın ﷺ qəbrini təkrar-təkrar və çoxlu ziyarət etmək. Misal üçün hər fərz namazdan sonra və ya hər gün xüsusilə müəyyən bir namazdan sonra ziyarət etmək. Bu davranış, Rəsulullahın ﷺ:

*"Qəbrimi bayram yerinə çevirməyin!"*

xəbərdarlığına ziddir. İbn Hacər əl-Heytəmi رحمه الله *"əl-Mişkat"* əsərinin şərhində belə deyir:

---

19 Əhməd İbn Hənbəl.

(عَادَهُ، إِعْتَادَهُ، تَعَوَّدَهُ) adəhu, i`tadəhu və təavvədəhu, *"onun adəti halına gəldi"* deməkdir. Hədisin mənası; *"Qəbrimi vərdişə çevrilən, çoxlu və təkrar-təkrar ziyarət edilən bir yer halına gətirməyin!"*dir. Buna görə Rəsulullah ﷺ *"Mənə xeyir-dua edin! Çünki salamınız, harada olsanız da mənə çatar!"* buyurmuşdur. Hədisdə kinayə yolu ilə buna işarə edilir.

İbn Rüşdün ﷺ *"əl-Cami li`l-Bəyan"* adlı əsərində isə bu zikr edilir: Rəsulullahın ﷺ qəbrini hər gün ziyarət edən bir əcnəbi haqqında İmam Malikə ﷺ sual verilir. İmam Malik ﷺ belə deyir: "Bu dindən deyildir. Sonra bu hədisi zikr edir: *"ALLAH`ım! Qəbrimi, ibadət edilən bir büt etmə!"* İbn Rüşd ﷺ belə deyir: "Rəsulullahın ﷺ qəbrinin önündən təkrar-təkrar keçərək Onu ﷺ salamlamaq və hər gün qəbrin yanına gəlmək məkruhdur. Bu, qəbri, hər gün orada namaz qılmaq məqsədi ilə gedilən məscid etməmək üçündür.

Rəsulullah ﷺ bundan çəkindirmiş və belə buyurmuşdur:

*"ALLAH`ım! Qəbrimi ibadət edilən bir büt etmə!"*

Qəbrin önündə hər gün bir dəfə və ya daha çox duran, salam verib dua edən, Mədinə əhlindən bəzi insanlar haqqında Qadı İ`yada ﵀ sual verirlər. O, belə deyir: "Fiqh əhlindən heç kimdən bu haqda mənə heç bir şey çatmadı. Bu ümmətin sonradan gələnləri ancaq öncəkilərin islah olduğu şeylə islah olacaqdır. Mənə bu ümmətin öncəkilərinin bunu etdiklərinə dair heç bir şey çatmadı."

**Yeddinci xəta:** Məscid-i Nəbəvinin hər yönündən Rəsulullahın ﷺ qəbrinə doğru dönmək, məscidə hər girişdə və ya hər namazdan sonra üzünü qəbrə çevirmək. Əlləri bağlayaraq başı önə əymək və bu şəkildə salam vermək. Bu davranışlar, insanlar arasında yayılmış bidətlərdəndir.

ALLAH`ın qulları! ALLAH`dan ﷻ qorxun, bidətlərdən və İslama zidd olan davranışlardan çəkinin! Şəhvətdən və kor-koranə təqliddən çəkinin! Əməllərinizi dəlilə əsaslanaraq edin!

ALLAH belə buyurur:

***"Məgər RƏBB`indən bir dəlilə olan (****dəlilə istinad edən****) kimsə pis əməli özünə yaxşı göstərilən kimsə kimidirmi?! Belələri öz nəfslərinə uymuşlar."***[20]

ALLAH ﷻ məni və sizi, Rəsulullahın ﷺ yolunda gedənlərdən etsin! Eşitdiyiniz bu sözləri söyləyir və ALLAH`dan ﷻ bağışlanma diləyirəm!

Ehsanı üçün ALLAH`a həmd olsun! Müvəffəqiyyətli etməsi və nemətləndirməsi səbəbilə Ona şükürlər olsun! ALLAH`dan başqa haqq ilah olmadığına şəhadət edirəm. O, Təkdir və şəriki yoxdur, şanı ucadır.

---

20 Muhəmməd surəsi, 47/14.

Şəhadət edirəm ki, Muhəmməd Onun qulu və Rəsuludur. ALLAH`ın عز وجل rizasına dəvət edəndir. ALLAH Ona, əhli-beytinə, əshabına və din qardaşlarına xeyir-dua və çoxlu salam etsin!

Bundan sonra... Ey ALLAH`ın qulları! ALLAH`dan layiqincə qorxun! Ona itaət edin və Ona qarşı asi olmayın!

ALLAH عز وجل belə buyurur:

***"Ey iman gətirənlər! ALLAH`dan qorxun və (****imanında, sözündə, işində****) doğru olanlarla olun! (****Peyğəmbər və onun sadiq əshabələri ilə birlikdə olun!****)"***[21]

Ey müsəlmanlar! Mədinə-i Nəbəviyyəni ziyarət edən kişilərə, Bəqi qəbiristanlığını və Uhud şəhidlərini, onlara salam vermək və onlar üçün dua etmək məqsədilə ziyarət etmələri məşrudur. Bureydə رضي الله عنه belə deyir:

21 ət-Tövbə surəsi, 9/119.

"Rəsulullah ﷺ, onlara qəbiristanlıqlara getdikləri zaman belə demələrini öyrədirdi:

*"Bu diyarın mömin və müsəlman sakinləri! Salam sizin üzərinizə olsun! Biz də ALLAH`ın izni ilə sizə qovuşacağıq! ALLAH`dan bizim və sizin üçün afiyət diləyirəm!"*[22]

Qəbir ziyarəti, bu iki böyük məqsəd üçün məşru edilmişdir:

**Birincisi;** ziyarətçinin ibrət alması və ölümü xatırlaması üçündür.

**İkincisi;** ziyarət edilən üçündür. Onun üçün ALLAH`a ﷻ dua edilir. ALLAH`ın ﷻ ona rəhmət etməsi və onu bağışlaması istənilir.

Qəbir ziyarətinin caiz olması üçün ziyarətdə pis söz söyləməmək şərtdir. Bu sözlərin ən böyüyü şirk və küfrdür. Bureydə atasından رضي الله عنهما, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

---

22 Muslim.

*“Sizə qəbir ziyarətini qadağan etmişdim. Kim ziyarət etmək istəyirsə ziyarət etsin! (Orada) pis söz söyləməyin!”*[23]

Mədinədəki bu qəbirlərin və başqa qəbirlərin ətrafında tavaf etmək, onlar tərəfə və ya onların arasında namaz qılmaq, Quran oxumaq, dua etmək və buna bənzər ibadətlər etmək caiz deyildir. Çünki bunlar aləmlərin RƏBB`i ALLAH`a ﷻ şirk qoşulmasına yol açan davranışlar, üzərində məscid bina edilməsə belə qəbirləri məscidə çevirməkdir. Aişə رضي الله عنها və İbn Abbas رضي الله عنهما deyirlər ki: Rəsulullah ﷺ ölüm ayağında belə buyurur:

*“ALLAH yəhudilərə və xristiyanlara lənət etsin! Onlar peyğəmbərlərinin qəbirlərini məscidlərə çevirdilər!”*[24]

Rəsulullah ﷺ belə buyurur:

---

23 ən-Nəsai.

24 əl-Buxari.

*"İnsanların ən şərliləri Qiyamət qoptuğunda həyatda olanlar və qəbirləri məscidə çevirənlərdir."*[25]

Əbu Mərsəd رضي الله عنه, Rəsulullahdan ﷺ belə eşitdiyini rəvayət edir:

*"Qəbirlərin üstündə oturmayın və onlara tərəf namaz qılmayın."*[26]

Əbu Said əl-Xudri رضي الله عنه, Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Qəbirlər və hamamlardan başqa bütün yer üzü məsciddir."*[27]

Ənəs رضي الله عنه, Rəsulullahın ﷺ qəbirlər arasında namaz qılmağı qadağan etdiyini rəvayət edir.[28]

---

25 Əhməd İbn Hənbəl.
26 Muslim.
27 Əhməd İbn Hənbəl.
28 İbn Hibban.

Qəbirlərin üstündə səcdə etmək caiz deyildir. Əksinə bu cahilcə və bütpərəstcə bir davranışdır. Batil bir düşüncə və ağılsız bir hərəkətdir. Bu və digər qəbirləri ziyarət edənlərin onlara əl sürtməsi, öpməsi, bədəninin bir bölümünü qəbrə yaslaması, şəfa tapması üçün torpağını üstünə səpməsi və ya yuyunmaq üçün bir miqdar torpağından alması caiz deyildir. Yenə ziyarətçinin bərəkət umaraq saçının bir qismini, məndilini və ya rəsmini qəbrin torpağına basdırması caiz deyildir.

Qəbirlərə pul, buğda və buna bənzər şeylər atmaq caiz deyildir. Bu cür davranışlardan hər hansı birini edənin tövbə etməsi və bir daha onu etməməsi vacibdir.

Qəbirləri ətirləndirmək; ALLAH`dan ﷻ "onların haqqı və ya məqamı üçün" istəmək caiz deyildir. Əksinə bu haram edilən bir təvəssül şəklidir. Şirkə yol açan davranışlardandır.

Qəbirlərin üstündə şəkil çəkmək də caiz deyildir. Çünki bu, onların ucaldılmasına

və onların vasitəsilə fitnəyə düşülməsinə səbəb olur. İslama zidd olan bu cür hərəkətlər etmək, qəbiristanlıqda istəyənlərə ətir, buğda və buna bənzər şeylər satmaq da caiz deyildir.

Ölülərdən yardım istəmək, onlardan mədəd ummaq; onlara səslənib, onlardan ehtiyacını təmin etməsini, fayda gətirməsini və bəlalardan qorumasını istəmək böyük şirkdir. Bu, edəni İslam dinindən çıxarar, bütpərəstlərdən edər. Çünki bəlaları və çətinlikləri ancaq ALLAH ﷻ yox edə bilər. ALLAH ﷻ belə buyurur:

***"…Bu sizin RƏBB`iniz olan ALLAH`dır, mülk Onundur. Sizin Ondan qeyri ibadət etdikləriniz bir çəyirdək qabığına belə sahib deyillər. Əgər siz onları çağırsanız (****dua etsəniz****), onlar sizin çağırışınızı eşitməzlər; eşitsələr də cavab verə bilməzlər. Özləri də Qiyamət günü sizin (****Onları ALLAH`a****) şərik qoşduğunuzu (****onlara büt kimi ibadət etdiyinizi****) danacaqlar. (****Ya***

*Peyğəmbər!*) ***Heç kəs sənə hər şeydən xəbərdar olan*** (*ALLAH*) ***kimi xəbər verə bilməz!"***[29]

ALLAH ﷻ belə buyurur:

***"De: "***(*ALLAH`dan*) ***başqa tanrı güman etdiklərinizi*** (*köməyə*) ***çağırın! Onlar sizi nə möhnətdən qorumağa, nə də onu dəyişməyə*** (*sizdən sovuşdurub başqasına tərəf yönəltməyə*) ***qadir deyillər! Onların tapındıqları tanrıların özlərindən hər hansı biri*** (*ALLAH dərgahına*) ***daha yaxın olsun deyə, RƏBB`inə vəsilə axtarır, Onun rəhmətini umur, əzabından qorxur. Həqiqətən, RƏBB`inin əzabı qorxuludur!"***[30]

ALLAH`dan layiqincə qorxun, ey ALLAH`ın qulları! Bütlərə tapanların və şeytanın dostlarının davranışlarından çəkinin! Çünki onlar məscidləri tərk edib, qəbirləri ucaldırlar. ALLAH`a ﷻ sığının və başınıza gə-

---

29 əl-Fatir surəsi, 35/13-14.
30 əl-İsra surəsi, 17/56-57.

lən çətinlikləri uzaqlaşdırmasını ALLAH`dan ﷻ diləyin! ALLAH ﷻ belə buyurur:

***“Əgər ALLAH sənə bir sıxıntı versə,*** (*səni ondan*) ***ALLAH`dan başqa heç kəs qurtara bilməz. Əgər*** (*ALLAH*) ***sənə bir xeyir yetirsə*** (*heç kəs Ona mane ola bilməz*)***. Çünki O, hər şeyə Qadirdir! O Öz qulları üzərində Hakimi-Mütləqdir. O, Hikmət sahibidir,*** (*hər şeydən*) ***Xəbərdardır!”***[31]

İnsanların ən xeyirlisinə xeyir-dua və salam edin! Çünki bunu sizə ALLAH ﷻ əmr etmişdir. O ﷻ belə buyurur:

***“Həqiqətən, ALLAH və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər*** (*xeyir-dua verirlər*)***. Ey iman gətirənlər! Siz də ona salavat göndərib*** (*onun üçün salavat deyib*) ***layiqincə salamlayın!”***[32]

---

31 əl-Ən`am surəsi, 6/17-18.
32 əl-Əhzab surəsi, 33/56.

